AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 3 (269), 84-91
https://dx.doi.org/10.48445/z6679-7441-5384-v

**AZƏRBAYCAN ƏDƏBİYYATI**
**NİZAMİ GƏNCƏVİ – 880**

# Nizami Gəncəvi və natiqlik sənəti

***Vaqif Qurbanov***
Pedaqogika üzrə elmlər doktoru, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: qurbanov.43@mail.ru
https://orcid.org/0000-0001-7665-3938

***Sevil Hümmətova***
Pedoqogika üzrə fəlsəfə doktoru, dosent. Azərbaycan dili və onun tədrisi metodikası kafedrası, Bakı Slavyan Universiteti. Azərbaycan. E-mail: sevil1966@bk.ru
https://orcid.org/0000-0002-6903-4749

**XÜLASƏ**
Məqalədə Nizami Gəncəvi və natiqlik sənəti ilə bağlı vəzifələrdən bəhs olunur. Deyilir ki, dahi Nizamini bu aspektdən də öyrənməyə borcluyuq. Bu, əvvəla, dilimizə olan məhəbbətin qayğısı olar. İkincisi, dil təlimi ilə mədəni nitqə yiyələnmiş natiqlər məşğul olmalıdırlar. Filoloq-müəllim ilk növbədə natiq olmalıdır. Nizami Gəncəvi qəhrəmanları natiqlik zirvəsində olan insanlardır. Belə ki, şair Şərq dünyasında ilk dəfə olaraq natiq obrazı yaratmışdır. Natiqlik bir məharətdir, natiqliyə yiyələnmək isə mədəniyyətə yiyələnmək deməkdir. Hazırki dövrdə bu peşə bizə daha çox lazımdır, xüsusən də dahi şairin 880 illik yubileyinə hazırlıq dövründə bu mövzu daha çox aktuallıq kəsb edir. Müəlliflər məqalədə ümumtəhsil məktəblərində "Nitq mədəniyyəti" fənninin tədris edilməsi zərurətini vurğulayır, bu işdə Azərbaycan dili və ədəbiyyat müəllimlərinin rolunun vacibliyini diqqətə çatdırırlar.

**AÇAR SÖZLƏR**
nitq mədəniyyəti, natiqlik sənəti, bədii oxu, nitq inkişafı, təfəkkür inkişafı, filoloji tələblər

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 12.07.2021
qəbul edilib: 22.07.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 3, VOL. 269, 84-91
https://dx.doi.org/10.48445/z6679-7441-5384-v



# Nizami Ganjavi and the art of oratory

***Vagif Gurbanov***
Doctor of Pedagogical Sciences, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: qurbanov.43@mail.ru
https://orcid.org/0000-0001-7665-3938

***Sevil Hummatova***
Doctor of Philosophy in Pedagogy, Associate Professor. Department of Azerbaijani language and its teaching methods. Baku Slavic University. Azerbaijan.
E-mail: sevil1966@bk.ru
https://orcid.org/0000-0002-6903-4749

**ABSTRACT**
The article deals with Nizami Ganjavi and his duties in the field of public speaking. It is said that we are obliged to study the great Nizami from this aspect as well. This will be the concern of our love for our language in the first place. A philologist teacher must first be a speaker. Nizami Ganjavi's heroes are people at the peak of oratory. Thus, for the first time in the Eastern world, the poet created the image of a speaker. Oratory is a skill, and mastering oratory means mastering culture. Today, we need this profession more, especially in the run-up to the 880th anniversary of the great poet, this topic is more relevant. The authors emphasize the need to teach the subject of "Speech Culture" in secondary schools, emphasizing the importance of the role of teachers of the Azerbaijani language and literature in this work.

**KEYWORDS**
speech culture, oratory, reading, speech development, thinking development, philological requirements

**ARTICLE HISTORY**
Received: 12.07.2021
Accepted: 22.07.2021

**Giriş / Introduction**

“Azərbaycan dili” fənni I-XI siniflərdə, orta ixtisas və ali təhsil müəssisələrində aparıcı fənn kimi öyrədilir. Fənnin tədris edilməsinin başlıca məqsədi şagirdləri və tələbələri nitq mədəniyyətinin sirlərinə yiyələndirməkdən ibarətdir. Beləliklə, dil təlimi nitq mədəniyyətinə yiyələnməkdə bir vasitə rolunu oynayır. Filoloq müəllimlər akademik və ya müəllim natiqlər hesab olunurlar. 880 illiyini keçirdiyimiz Nizami Gəncəvi şair olmaqla yanaşı, həm də Şərq ədəbiyyatında natiq obrazı yaratmış düha sahibi kimi öyrənilir.

Bildiyimiz kimi, nitq mədəniyyəti nəzəriyyə, natiqlik isə bir sənətdir. Bu sənətə söz sənəti də deyilir. N.Gəncəvi sözü nitqin əsası hesab edir. Bütün dini kitablarda da bu belədir. “Bibliya”da yazılır: “Slovo – reçi osnovo”. Söz nədir? Söz linqvistik cəhətdən mənalı səslər toplusudur. Fəlsəfi mənada isə, Allahın verdiyi ən müqəddəs nemətdir. Onu Allah insanlara ünsiyyət saxlamaq vasitəsi kimi vermişdir. Ona görə də Nizami Gəncəvi sözü daha çox vəsf edir. O, “Sirlər xəzinəsi” poemasında yazır ki, söz hətta düşüncədən də əvvəldir. Şair bu məsələdə sanki klassik yunan-roma filosofları ilə polemikaya girir:

Düşüncənin əvvəli, bütün sayların sonu,
Sözdür, yadında saxla, unutma əsla bunu!
Söz bayraqdan daha tez əldə eyləyər zəfər,
Qılıncdan daha kəskin qalxıb alar ölkələr
[1, s.3].

Nizami Gəncəvi öz əsərlərində söz bilənləri, natiqləri yüksək qiymətləndirir. Onun qəhrəmanları (Şirin, Şəkər, Nüşabə, Kərpickəsən qoca, habelə digər qocalar və Tutiyanuş) natiqdirlər. Aşağıdakı iki məqama diqqət yetirsək, dahi şairin natiqləri necə qiymətləndirdiyinin şahidi ola bilərik:

“Ona rast gələndə bir qatı düşmən,
Döyüşdə işləri bərkə düşərkən,
Əvvəlcə qızılı işə salardı,
Qızıl tək işləri tez həll olardı.
Qızıl iş görməsə, iş olsa mahal,
Qılınca atardı əlini dərhal.
Qılınc eyləməsə bu işə çara,
Onu tapşırardı əfsunçulara.

Onlar da bir iş görməsə əgər,
Qabağa çıxardı onda natiqlər.
Elə natiqlər ki, dilləri atəş,
Heyrandı onlara səmada günəş.
Alim uzaqgörən Hikmət ərbabı"
[2, s.75].

Nizami göstərir ki, böyük İsgəndər öz yanında xüsusi adamlardan ibarət "altı dəstə" saxlayırdı. Həmin dəstənin ən irəlidəki (ön) səflərindən birincisi "işbilən", "dilləri atəş olan", "uzaqgörənliyi ilə fərqlənən", "hikmət adamları", yəni natiqlər təşkil edirdi. Şair onu da qeyd edir ki, həmin altı dəstənin görə bilmədiyi ən çətin işləri məhz natiqlər yerinə yetirirdilər [1, s.75].

Bax, budur, Nizaminin natiq qəhrəmanları. Dahi şair onlardan birinin obrazını "İskəndərnamə" əsərində yaratmışdır:

"Bir rumlu var idi, olduqca insan,
Natiqdi bir neçə dildə danışan.
Alimdi hər fikri, sözü qurmaqda,
Mahirdi ox atıb, qılınc vurmaqda.
O qədər kəskindir sözü, hünəri,
Özünə cəzb edər, dinləyənləri.
Söhbəti tutini kəməndə salmış,
Özü Tutiyanuş adını almış.
Sarayda nədimdi həm də arabir,
Ay, günəş sirrindən söhbətlər edir.
Yanına çağırdı onu İskəndər,
Elçilik eyləyib aparsın xəbər.
Hazırlaşsın yola bir an durmadan,
Zənci sərdarına çatdırsın fərman.
Kəskin qılıncını tanıtsın ona,
Qayıtsın, bəlkə də, doğru yoluna
[2, s.75].

Azərbaycan klassik ədəbiyyatında yaranmış natiq obrazlarından biri Tutiyanuşdur. Digər natiqlər kimi o da kainat haqqında, ayın, günəşin ölməzlik ideyası haqqında, hikmət haqqında danışır. Əlbəttə, bunlar hamısı dahi şairin öz sözləridir. Həmin məqam Nizami Gəncəvinin Sokrata, Platona, Aristotelə bələd

olduğunu və “İskəndərnamə”də 7 alimlə və onlardan başqa ayrıca peşəkar natiqlərlə də öz fikirlərini bölüşdüyünü göstərir. Nizami Gəncəvi bir çox məsəllərdə qoca natiqlərin alimlərdən daha dərinə getdiklərini qeyd edir. Xüsusilə də İskəndərin zülmət dünyasına səyahət, dirilik suyu axtarışları zamanı və s. Onlardan bir neçəsini xatırlamaq Nizamisevərlər üçün çox maraqlı fakt ola bilər. Belə ki, yeddi alim zülmət dünyasına necə enməyin və qayıdarkən işıqlı dünyaya çıxmağın çarəsini tapa bilmirlər. Lakin bir qoca atların bu işdə kara gələcəyini söyləyir və deyir ki, atın balasını quyunun başında saxlamaqla onu zülmət dünyasına sürüb aparmaq və geri qayıtmağın yolunu atla müəyyənləşdirmək olar. Çünki onun hissiyyatı daha güclüdür, balasının harda saxlandığını biləcəkdir.

Nizami Gəncəvi özü bir şair, natiq olaraq ictimai şəraiti nəzərə alır, keçmişin adil hökmdarlarını öz müasirlərinə, hətta dastan sifarişçilərinə nümunə göstərir. Xosrovun atası Hörmüz öz yeganə oğluna qanunları pozduğuna görə cəza vermək istəyir. Nizami indiki hökmdarlara belə deyir:

“İndi yüz fəqirin tökülə qanı,
Halına yanacaq bir insan hanı?”

Eyni zamanda, “İskəndərnamə” əsərində o, azad, firavan gələcək haqqında xəyallar qurur, düzlüyü, halallığı idealizə edərək yazır:

“Bizdə bərabərdir hamının varı,
Bərabər bölərik bütün malları.
Bizdə artıq deyil kimsədən heç kəs,
Bizdə ağlayana bir kimsə gülməz”.

Bütün bunlar şair-natiqin öz dilindən deyilən hikmətli sözlərdir. Həmçinin bu sözlər natiqlər üçün də deyilib. O cümlədən, bədii natiqlər və ya bədii söz ustaları “Bərdənin tərifi”, “Xeyir və Şər”, “Az danışmağın gözəlliyi” və s. bu kimi parçaları deklomasiya edə-edə formalaşırlar. Həmin parçalar Azərbaycanda bədii natiqlik sənətinin inkişafında əvvəllər olduğu kimi, indi də müsbət rol oynamaqdadır.

Nizami yaradıcılığında qeyd etdiyimiz bu qiymətli parçalar ölkəmizdə müəllim-natiqlik sənətinin inkişafında da müstəsna rol oynamışdır. Bildiyimiz kimi, ölkəmizdə dünya səviyyəsində natiqlər yetişmişdir. Nizami əsərlərindən parçaları yüksək səviyyədə Azərbaycan, rus və digər dillərdə tədqim edən Mikayıl Rəfili, Məmməd Hüseyn Təhmasib, Cəfər Xəndan, Şıxəli Qurbanov və başqalarını misal göstərə bilərik.

Yeri gəlmişkən, onu xüsusilə qeyd etməliyik ki, Ümummilli liderimiz H.Əliyev

dünyada siyasi natiq kimi tanınır və yüksək qiymətləndirilir. Universitetlərdə "Nitq mədəniyyəti və natiqlik sənəti" seçmə fənnində "Heydər Əliyev natiqlik kursu" öyrənilir. Burada iki məqamı tələbələrə çatdırmaq onlarda xüsusi marağa səbəb olur. Həmin məqamlardan biri Ümummilli lider H.Əliyevin vaxtilə ədəbiyyat müəllimi olmuş Lətif Hüseynzadənin xatirələrindən, ikincisi isə, akademik Ağamusa Axundovun söhbətlərindən xülasə edilmişdir.

Lətif Hüseynzadə deyərdi ki, Heydər Əliyev Naxçıvanda oxuyarkən, ədəbiyyat dərnəyində Nizami qəhrəmanlarının rolunu məharətlə oynayar və sözlərini deklomasiya edərdi. Onun ifasında Xosrov və İskəndərlə bağlı səhnələr çox möhtəşəm görünərdi. Hündürboylu, cəngavər cüssəli bu gəncin nitqi də təsiredici və təlqinedici səslənərdi. Onun yeddi alim məclisində Nizami qiyafəsində şairi təmsil etməsi xüsusi ilə diqqətçəkici məqam hesab edilirdi. O vaxtlar bu cür səhnələrin qurulması Nizami deklomasiyalarının yaranması ilə nəticələnərdi. Məktəblərdə bunlar get-gedə yayılmağa başlayar, nəticələri müzakirə olunar və qiymətləndirilərdi.

Akademik Ağamusa Axundov televiziya verilişlərində apardığı söhbətlərində mütəmadi olaraq Ümummilli lider H.Əliyevin nitq mədəniyyətinin tədqiqi və təbliği işinə diqqət yetirməyindən danışardı: "Bir dəfə Heydər Əliyev məndən soruşdu ki, hazırda Nizami adına Dilçilik İnstitutunda nə ilə məşğul oluruq? Cavab verdim ki, dili tədqiq edirik. O isə mənə dedi: Dili tədqiq etdiniz və keçən əsrin 70-ci illərində yazdığınız kitablara görə Dövlət Mükafatına da layiq görüldünüz. İndi siz nitq mədəniyyətini tədqiq və təbliğ edin. Nitq mədəniyyəti akademik səviyyədə tədqiq olunmalı və bütün məktəblərdə tədris edilməlidir". Bu sözlər ulu öndərin dil və nitq mədəniyyətimizə diqqət və qayğısının bariz nümunəsi, həm də onun bizim hamımızdan daha dərindən düşündüyünə bir sübut idi.

Onu da qeyd etməliyik ki, ölkə prezidentimiz cənab İ.Əliyevin Azərbaycan, rus, ingilis və s. dillərdə parlaq nitqi Nizami Gəncəvi ənənələrinin sadiqliyinə ən gözəl sübutdur. Çünki dahi Nizami vaxtilə "natiqdir bir neçə dildə danışan" ifadəsini işlətmişdir. Məlumdur ki, rus natiqləri onun çıxışlarının dünya auditoriyalarına hesablandığını qeyd edib tərifləyir və bu işdə həm ailədən gələn ənənənin, həm də onun təhsilinin böyük rol oynadığını vurğulayırlar.

Filoloq-müəllimlərimiz Nizami Gəncəvi irsini öyrənərkən bu kimi cəhətlərə diqqət yetirməlidirlər. Nizaminin böyüklüyü onun qəhrəmanlarının nitqlərindən məlum olur. Təsadüfi deyil ki, böyük özbək şairi Əlişir Nəvai Nizaminin dahiliyi haqqında belə yazmışdır:

“Bu meydanda asan deyildir durmaq,
Nizamiylə pəncə-pəncəyə vurmaq.
Nizami bir fil ki, yox bərabəri,
Söz incisi ondan almış dəyəri”.

Biz hələ Nizamini öyrənmək və təbliğ etmək, habelə müəllim natiqliyini inkişaf etdirmək cəhətdən çox işlər görə bilərik. Bu işdə həm 880 il geriyə, həm də 880 il gələcəyə baxmağı bacarmalıyıq. Allah bizlərə 11 iqlim qurşağından 9-nu verməklə yanaşı, Nizami Gəncəvi kimi dahi bir şəxsiyyət də bəxş etmişdir. Çox istərdik ki, təhsil müəssisələrimizdə “Nizami Gəncəvi və natiqlik sənəti” kursu ayrıca seçmə fənn kimi tədris edilsin, xüsusi muzeylər yaradılsın. Həmin muzeylərin divarlarını isə dahi şairin natiqlərin dilində əzbər olan müdrik kəlamları bəzəsin. Gənc natiqlər bu kimi hikmətləri necə təqdim etməyi öyrənsinlər:

“Qüvvət elmdədir, başqa cür heç kəs,
Heç kəsə üstünlük eyləyə bilməz”.

“Bir elm öyrənmək istədikdə sən,
Çalış ki, hər şeyi kamil biləsən”.

“Sözün qanadları var, quş kimi incə-incə,
Dünyada söz olmasa, nəyə gərək düşüncə”.

“Çox danışmaq, bəlkə, sənə asandır,
“Çox oldu” desələr, böyük nöqsandır”.

“Eşq daşın qəlbinə düşərsə əgər,
Özünə yaqutdan məşuq düzəldər”.

“Maqnit olmasaydı eşqin əsiri,
Özünə çəkməzdi dəmir zənciri”.

“Kaiantda hər şey cəzbə bağlıdır,
Filosoflar onu eşq adlandırır”.
“İdrakı dindirsək söyləyər o da,
Hər şey eşq üstündə durur dünyada”.

## Nəticə / Conclusion

Son illər Nizami Gəncəvi irsinin öyrənilməsi sahəsində bir coşqunluq hiss edilir. Azərbaycan dili və ədəbiyyat müəllimlərinin bu işdə rolu əvəzsizdir. Unutmamalıyıq ki, bu gün bizə Nizami hikmətini, Heydər Əliyev nəsihətləri və vəsiyyətlərini öyrənmək çox vacibdir. Bunun üçün nəzərə almalıyıq ki, "Təhsil millətin gələcəyidir". "Nitq mədəniyyəti bütün məktəblərdə yüksək səviyyədə tədris olunmalıdır". "Mədəniyyəti yüksək olan xalq həmişə inkişaf edəcək, həmişə irəli gedəcək". Bu məqalədən çıxan əməli nəticə məhz bunlardan ibarətdir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Gəncəvi N. (1976). Bakı, Gənclik. 167 s.
2. Əsgərov M.Ə. (1975). Natiqlik sənətinin əsasları. Bakı, Maarif nəşriyyatı. 259 s.
3. Nizami Gəncəvinin həyat və yaradıcılığının ümumtəhsil məktəblərində tədrisi məsələləri. (1987). Bakı, Maarif nəşriyyatı. 167 s .
4. Qurbanov V., Xalıqov F., Abbasova S. (2018). Azərbaycan dili və nitq mədəniyyətinin əsasları. Bakı, Müəllim nəşriyyatı. 186 s.